Din və elm arasında konflikt və antoqonizmin olması iddiası zamanımızın ən çox maraqla müzakirə edilən mövzularındandır. Nisə Haciyeva xanımın yazdığı "Elm və din: ziddiyyət, yoxsa vəhdət?" adlı məqaləsində ələ aldığı mövzu da bununla bağlıdır. Onun öz məqaləsində qeyd etdiyi kimi bu fikir on doqquzuncu əsrin iki amerikalı alimi Andrew Dickson White (1832-1918) və John William Draper (1811-1882) tərəfindən irəli sürülüb. Onlar bu fikri mənimsəmiş ilk elm adamları olmayıblar, lakin bu fikri məşhurlaşdırmağı bacarıblar. On doqquzuncu əsrin əvvəllərində "təbiət fəlsəfəsi" olaraq bilinən təbiət elmləri üçün "elm" adının xüsusilə işlədilməsindən başlayaraq dini elmlər və təbiət elmləri arasında ziddiyyətin axtarılması normal bir hala çevrildi. Thomas Dick'in 1823-cü ildə "*The Christian Philosopher; or, The Connection of Science and Philosophy with Religion*" (*Xristian Filosof; yoxsa Elmin və Fəlsəfənin Din ilə Əlaqəsi*) adı ilə nəşr etdiyi kitabı bəlkə də bu fərqi adında daşıyan ilk kitabdır.

Bu yazımızda mövzu haqqında çoxumuzun nəzərdən qaçırdığı bəzi nöqtələrə toxunmağa və din ilə təbiət elmləri arasında ziddiyyətin olması iddiasının tutarsızlığını göstərməyə çalışacağıq. Yazımızı Nisə xanımın məqaləsindən çıxış edərək yazdığımız üçün onun bəzi fikirləri barəsində rəylərimizi qeyd etməyi unutmamışıq. Ümumilikdə məqaləsində gözəl üslub, sakit ton xəttini izlədiyi üçün və bütün məqalə boyunca buna sadiq qaldığı üçün Nisə Hacıyevanı təbrik edirik və bu şəkildə araşdırmalar aparmağa təşviq edirik. Məqalədə razılaşa bilmədiyimiz məqamları bacardığımız qədər dolğun şəkildə işıqlandırmağa çalışacağıq. Qeyd edək ki, bu mövzuda ortalıqda dildən dilə dolaşan bəzi əfsanələr, miflər vardır ki, çox təəssüf ki, Nisa xanım da onların qurbanı olub. Bu mifləri çoxumuz düşünmədən təkrarlayırıq. Məqaləmizdə onlardan bəziləri haqqında danışacağıq.

Məqaləyə gəldikdə diqqətimizi çəkən ilk incəlik məqalənin başlığı oldu. "Ziddiyyət yoxsa vəhdət" adı qarşımıza yalnız iki seçim çıxarır, halbuki araşdırmanın özünü diqqətlə oxuyan oxucu orada seçimlərin ikidən çox olduğunu görəcək. Stephen Jay Gould'un səsləndirdiyi "NOMA" (Non-Overlappin Magisteria[1]/Kəsişməyən Təhsil Nüfuzu) fikri nə ziddiyyətin, nə də vəhdətin tərəfdarıdır. Ona görə bu iki təhsil sahəsi bir-birilərini inkar etməyən və bir-biriləri ilə kəsişməyən iki ayrı təlim və mərifət qaynağıdır: araşdırma metodları, faktları və dəyərləri tamamilə fərqlənir.[2] Beləliklə də seçimin yalnız ziddiyyət və vəhdət arasında olmadığını deyə bilərik. Bu baxımdan məqalənin adı oxucunu yalnız bu ikisi arasında seçim etməyə çağırdığı üçün – bizə görə - heç də uğurlu alınmayıb.

Bəlkə də bu müqayisə dindarlar və elm adamları arasında aparılsaydı etiraz edən tərəflərin sayı az olardı, çünki dindarlar hər zaman dinin həqiqi mahiyyətini təmsil etmirlər, eləcə də elm adamları da hər zaman elmin mahiyyətini təmsil etmirlər. Bu müqayisəni dinin özü ilə təbiət elmləri arasında aparmaq daha çox mübahisəyə səbəb olacaq. Bu nöqtədə də Nisa xanımla razıyıq ki, bu mübahisələr daha çox "elm" və "din" anlayışının fərqli interpretasiyasından yaranır. Razı olmadığımız nöqtə isə budur ki, burada elm mərkəzə gətirilir, din isə marginallaşdırılır. Məqalədə bu açıq şəkildə qeyd edilməsə də oxucunun aldığı təəssürat budur ki, həqiqəti öyrənməyin əsas yolu təbiət elmləridir. Nisa xanım "necə" sualını təbiət elmlərinə, "niyə" sualını isə dinə və fəlsəfəyə tərk edir. Bu cür yanaşma həqiqəti tam surəti ilə əks eləmir. Əksinə dinin cavab verdiyi

[1] Dilimizdə işlənən magistr sözü ilə eyni kökü bölüşür, çünki magistr latın dilindən tərcümədə müəllim deməkdir.

[2] Stephen Jay Gould, "Leonardo's Mountain of Clams and The Diet of Worms; Essays on Natural History", səh: 274; The Belknap Press of Harvard University Press, Cambridge, London, 2011

suallar təbiət elmlərinin cavab verdiyi suallardan daha çox və daha əhəmiyyətlidir. Din təkcə “niyə?” sualına deyil, həm də “necə?” sualına da cavab verir. Təbiət elmləri bizə ətrafımızdakı dünyanın “necə olduğunu” izah edirsə burada heç bir vəch ilə “necə olmalıdır?” sualına cavab vermir. Misal üçün təbiət elmləri hamilə qadının içki içərkən qarnındakı uşağa necə zərər verdiyini izah edir, lakin “həmin qadın özünü necə aparmalıdır?” sualında tamamilə neytraldır. İçki içməsi mənəvi olaraq xətalıdırmı? Hamilə qadınların doğuş zamanı “necə?”, yəni “nə səbəblə?” öldüyünü tibb elmi izah edə bilir, amma heç bir halda ana ilə uşaq arasında seçim edərkən “necə?” davranmalıyıq sualına cavab verə bilmir. Bütün bu suallar dinin magisterium’una daxildir. Əxlaq fəlsəfəsində “...dır” və “olmalıdır” problemi kimi tanınan bu sualı on səkkizinci əsrin şotland filosofu David Hume (1711-1776) mənəviyyat barəsində yazdığı əsərində çox dəqiqliklə qabardır və bir şeyin necə olduğunu anlamağın “necə olmalıdır?” sualına cavab vermədiyini vurğulayır.[3] Hətta deyərdim ki, təbiət elmlərindən məhrum olmuş birinə normal şəkildə dini yaşamaq mümkündür, lakin dini dəyərlərdən məhrum olduqda elmi yaşamaq mümkün deyildir. Burada “dini dəyərlər” dediyimizdə bütün cəmiyyətlərin ayrılmaz hissəsinə çevrilmiş və dindən qaynaqlanan mənəvi dəyərlər nəzərdə tutulur. 1941-ci ildə Kopenhageni ziyarət etmiş Werner Heisenberg ilə onun dostu və mentoru Niels Bohr’un arasına acılıq və yadlıq qatan elmi müzakirələr olmadı, mənəvi bir mühakimə oldu. Heisenberg müttəfiqlərin atom bombasını almanlardan daha tez icad edə bilməklərindən rahatsız olduğu üçün Bohr’dan onlarla əməkdaşlıq etməsini istəyir. Belə bir istək qarşısında Bohr’un seçimi tamamilə onun mənəvi dəyəri ilə bağlı bir seçim olub. Kinolarda təsvir olunan alman hərbi maşınının şərir alimi roluna yaraya biləcək məşhur kimyaçı Fritz Haber 1918-ci ildə, yəni Birinci Dünya Müharibəsinin sonunda nobel mükafatına layiq görüldükdə buna etiraz edən alimlər az deyildi. Necə də etiraz etməsinlər?! Axı o “kimyəvi silahın atası” olaraq bilinir və müttəfiqlərə qarşı kimyəvi qazların istifadəsində şəxsən təşəbbüsü ilə tanınır. Ona nobel mükafatının verilməsinə qarşı edilən etirazın əxlaqi dəyərlərdən qaynaqlandığını sübut etməyə ehtiyac yoxdur. Amma minlərlə insanı həşərat kimi öldürən Fritz Haber kimi nobel alimi üçün əxlaqi dəyərin rolu nə olmalı idi?! Yaxud da Üçüncü Reyxin acımasız həkimi Josef Mengele’ni elmi eksperimentlərinə görə təbrik etməliyik yoxsa mənəviyyatsızlığına görə qınamalıyıq? Kaş ki, mənəviyyatı olsaydı da o dustaqların üzərində amansız eksperimentləri aparmazdı demirikmi?! Portuqaliyalı nevroloq Antonio Egas Moniz’in lobotomiya əməliyyatına görə nobel mükafatı almasını bu gün nəyə əsasən mühakimə edirik? Görəsən Albert Einstein nə üçün prezident Roosevelt’ə 1939-cu ildə göndərdiyi məktubu ilə atom proqramını başlatmağa təşviq etdiyinə görə peşmançılığını ifadə edirdi? Bütün bunlar bizə elm və din arasındakı əlaqənin nə qədər əhəmiyyətli olduğunu göstərir; elmi araşdırma metodlarını təbiət elmləri idarə edirsə onların həyatımızda tətbiqini şübhəsiz ki, dini-mənəvi dəyərlər idarə edir. Laborotoriyada canlıları test obyekti kimi istifadə etməyi qadağan edən mənəvi mühakiməmizdir. Naturalist dünya görüşü bu cür eksperimentlərdəki mənəvi problemləri heç cür sübut edə bilmir. Ona görə də Einstein 1930-cu ildə Berlində ikən din və elm haqqındakı fikirlərini qələmə alarkən yazırdı: “**Sən elmin mənəvi əsasları haqqında danışmaqda haqlısan, amma sən tərsinə dönüb mənəviyyatın elmi əsasları haqqında danışa bilməzsən.**”[4] Məhz bu baxımdan deyirik ki, elmsiz dinin yaşanması mümkündür, amma dinsiz elmin tətbiqi təsəvvür edə bilməyəcəyimiz fəlakətlərə gətirib çıxara bilər. Bunun ən bariz misalı mülkü əhali üzərinə atılmış atom bombasıdır.

---

[3] David Hume, “A Treatise of Human Nature”, səh: 334, Dover Publications, Mineola, New York, 2003
[4] Max Jammer, “Einstein and Religion”, səh: 69; University Press, Princeton, 1999

Təbiət elmlərinin dinsiz mövcud ola bilməyəcəyini başqa cür də göstərmək mümkündür. Təbiəti araşdırmaq istəyi və əzmi əsas etibarı ilə bəşər oğlunun içindəki dini inanclardan qaynaqlanır. Bizim təbiəti araşdırıb onu dərk etməyə çalışmağımız hər şeydən əvvəl təbiətin dərk edilə bilinəcəyi inancından asılıdır. Əgər insan təbiətin dərk edilə bilinəcəyinə inanmasaydı onu araşdırmağa cəhd etməzdi. Əgər biz təbiətin qanunlara tabe olduğuna, riyazi dəqiqliklə çalışdığına inanmasaydıq, bir Qanunverici'nin olduğuna inanmasaydıq təbiətin qanunlarını kəşf etmək yoluna baş vurmazdıq. Görkəmli ingilis filosofu C. S. Lewis bunu belə ifadə edir: "**İnsanlar ona görə elmi oldular ki, çünki onlar Təbiətdə Qanunun olmasını gözləyirdilər və onlar Qanunun olduğunu ona görə gözləyirdilər ki, çünki Qanunvericinin olduğuna inanırdılar.**"[5] Bu həqiqəti təkcə dindar alimlər təsdiqləmirlər. Qətiyyən dindar olmayan fizik Paul Davies qeyd edir ki, "**Alim yalnız əgər mahiyyət etibarı ilə teoloji olan dünya görüşü mənimsəyərsə o zaman elmlə məşğul ola bilər.**" O işarə edərək bildirir ki, "**ən qatı ateist alimlər belə inanc məsələsi olaraq qəbul edirlər ki, təbiətdə ən azından bir hissəsi bizim tərəfimizdən dərk edilə biləcək qanuna bənzər bir nizam mövcuddur.**"[6] Albert Einstein də bu həqiqəti etiraf edirdi: "**Elm yalnız tamamilə həqiqətə və idraka can atma arzusu ilə boyanmış kimsələr tərəfindən yaradıla bilər. Amma bu hissin qaynağı dindən gəlir. Mövcudluğumuz üçün keçərli olan qanunların rasional olmasının, yəni ağıl ilə dərk edilə bilən olmasının mümkünlüyünə inanmaq da bura aiddir. Məhz bu dərin imana sahib olmayan hər hansı bir alimi təsəvvür edə bilmirəm. Bu halı belə bir təsvir ilə ifadə etmək olar: dinsiz elm şikəstdir, elmsiz din isə kordur.**"[7] Təqdim etdiyimiz bu müqəddimədən çıxış edərək deyə bilərəm ki, keçmiş əsrlərdə əldə edilmiş ən böyük elmi nəaliyyətlərin aparıcı qüvvəsi dini inanclar olub. O alimlər üçün təbiətin sirlərini çözmək Galilei'in dili ilə desək "Allahın təbiət kitabını" oxumaqdan ibarət olub. Müsəlman dünyasında rəsədxanaların tikilməsi, tibbi araşdırmaların aparılması bir çox halda dinin tələbləri ilə bağlı olub. Namazın vaxtlarını, qiblənin istiqamətini öyrənmək üçün astronomiya, coğrafiya elmləri dərindən öyrənilib.

Müsəlman alimlərdən yazmışkən Nisa xanımın öz məqaləsində ələ aldığı tarixi bir iddiaya yaxından nəzər salmaq lazımdır. Nisa xanımın iddia etdiyinə görə "*səkkizinci əsrdən başlayaraq yunan fəlsəfəsinin təsiri ilə dünyanı rasional olaraq anlamağa çalışan İslam alimləri "kəlam" məktəbi yaradaraq həm təbiəti, həm Tanrını, həm də Quranı sorğuladılar.*" Daha sonra sözünə davam edərək əlavə edir ki, "*on ikinci əsrdə İslam filosofu Qəzali Aristotelin müsəlman davamçılarına qarşı çıxaraq fəlsəfi mövzuları rasional olaraq anlamağa çalışanları tənqid etdi.*" Nisa xanım bu iki cümləsində bir çox xətaya yol verir. Əvvəla heç bir İslam alimi Tanrını, nə də Quranı sorğulamayıb, lakin Tanrını və Quranı əqli dəlillər işığında anlamağa çalışıblar. Üstəlik həm "kəlam" məktəbi, həm də "fəlsəfə" məktəbi İslam teologiyasında rasional məktəblər sayılırlar. Bu məktəblərin hər ikisi də rasional əqli dəlilləri etibara alırdılar, yəni onları təmsil edən heç bir alim əqli dəlillərə qarşı müharibə açmayıb. əl-Ğazzəli də onlardan biri idi. Bilmək lazımdır ki, İslamda "fəlsəfə" tarix baxımından "kəlamdan" sonra gəlir və bu ekolun ilk müəllimi Yaqub bin İshaq əl-Kindi (805-873) sayılır. Avropada Alkindus adı ilə tanınan bu alim "ərəblərin filosofu" və ya "ilk müəllim" ləqəbləri ilə də tanınır. Bu ekolun digər məşhur üzvləri əl-Fərabi, İbn Sina və İbn Rüşd kimi alimlərdir. "Fəlsəfə" məktəbini təmsil edənə "filosof" və ya "həkim" dedikləri halda "kəlam" məktəbini təmsil edənə "mutəkəllim" deyirdilər və əl-Cuveyni, əl-Ğazzəli, ər-Razi və ət-Təftəzani kimi alimlər mutəkəllimlərin ən məşhur

---

[5] C. S. Lewis, "Miracles: a Preliminary Study", səh: 110; Collins, London, 1947;
[6] Templeton Prize Address, 1995, http://www.origins.org/articles/davies_templetonaddress.html.
[7] Max Jammer, "Einstein and Religion", səh: 94; University Press, Princeton, 1999

üzvlərindəndirlər. Mutəkəllimləri İslam fəlsəfəçilərindən ayıran ən əsas fərqlərdən biri bu idi ki, mutəkəllimlər Yunan fəlsəfəsinin təlimlərini İslama zidd görürdülər, İslam fəlsəfəçiləri isə Aristotelin təlimlərinin İslamın ruhuna müvafiq olduğuna inanırdılar. Lakin hər iki məktəb yunan filosoflarının işlətdikləri əqli alətləri qəbul edirdilər. Ona görə də Nisa xanımın əl-Ğazzəli haqqındakı iddiası tamamilə xətalıdır, çünki nə əl-Ğazzəli, nə də aid olduğu kəlam məktəbi rasional düşüncəni rədd etmirdi, əksinə qəbul edirdi. Məqalədə əl-Ğazzəli ilə filosoflar arasındakı münaqişə elm ilə din arasındakı münaqişə kimi göstərilir. Bu heç bir şəkildə həqiqəti əks etdirmir. Onun “Təhəfut əl-Fələsifə” kitabında[8] filosoflarla mübahisəsi və onları təkfir etməsi sırf teoloji məsələlər üzərində olub. Filosoflar aləmin qədim olduğunu deyərkən materiyanı yaxından incələdikləri üçün və ya uzaq ulduzları müşahid etdikləri üçün bunu demirdilər, sadəcə olaraq metafizik təsəvvürlərdən çıxış edərək bu nəticəyə gəlmişdilər. Onlara görə Allah qədimdir və qədimdən Yaradıcıdır, beləliklə də Allah əgər qədimdən yaradıbsa yaradılış da qədim olmalıdır. Bir sözlə İslam filosofları Allahın mövcudluğu ilə rasional düşüncəni birləşdirərək aləmin qədimliyini iddia edirdilər. Digər tərəfdən isə mutəkəllimlər rasional düşüncəni işlədərək bunun mümkün ola bilməyəcəyini deyirdilər. Onlara görə sonsuzluq materiyada imkansızdır, çünki sonsuzluğu çoxaltmaq və azaltmaq mümkün deyildir. Hər iki tərəf iddiasını rasional dəlillər üzərində qururdular. Bu günün astofizikası əl-Ğazzəli’nin dediklərini təsdiqləyir və kainatın bir başlanğıcının olması fikrinə dəlillər təqdim edir. Nisa xanımın İslam alimləri ilə bağlı müzakirəsinin sonunda ifadə etdiyi nəticə də doğru deyildir. “*Bundan sonra müsəlman dünyasında Tanrını, yaradılışı və Quranda deyilənləri sorğulamaq, şəriətə zidd fikirlər irəli sürmək artıq heç kəsin ixtiyarında deyil*” – deyir Nisa Haciyeva. Sanki əl-Ğazzəli’yə qədər İslam dünyasında Tanrını, yaradılışı və Quranda deyilənləri sorğulamaq hər kəsin ixtiyarında imiş. İslam coğrafiyasında pluralizmin olduğunu qəbul edirik, amma heç bir zaman Tanrını, yaradılışı və Quranda deyilənləri sorğulamaq normal qəbul edilməyib. Nə İslam filosofları, nə mötəzililər, nə də mutəkəllimlər bunları sorğulamayıblar. Bu, əl-Ğazzəli’dən əvvəl də belə idi, ondan sonra da elə davam edib.

Məqalədə əl-Ğazzəli haqqında verilmiş məlumatlar Nisa Haciyevanın öz ağlının məhsulu deyildir. Bu, məqaləmizin müqəddiməsində sözünü etdiyimiz miflərdən biridir. Steven Weinberg kimi nobel laureatı, Neil deGrasse Tyson kimi elmi kütləviləşdirən sima bu mifi təkrarlayaraq İslam aləmində təbiət elmlərinin süqutunda əl-Ğazzəli’ni əsas səbəb kimi göstərirlər. “**Təəssüf ki, on ikinci əsrdə İslam elmə qarşı döndü…**” yazır Steven Weinberg: ”**Ən nüfuzlu olan Əbu Həmin əl-Ğazzəli idi ki, o, … təbiət qanunları fikrinin özünə qarşı mübarizə aparırdı, çünki ona görə belə bir qanun Allahın əllərini qandallayır…**”[9] Pakistanlı fizik Pervez Hoodbhoy da eyni fikri səsləndirir və Nisa Haciyeva onun sözlərinə məqaləsində istinad edir. Bu fikrin qaynağını fransız tarixçisi Ernest Renan’a (1823-1992) və onun 1852-ci ildə nəşr etdirdiyi “Averroès et l’averroisme” (İbn Rüşd və ibnrüşdçülük) kitabına qədər izləmək olur. Hətta Frank Griffel’ə görə Ernest Renan özü bu fikirlərini iki alman əslli tarixçiyə, Solomon Munk (1803-67) və August Schmölders’ə (1809-80) borclu idi. əl-Ğazzəli haqqında belə bir təsəvvür əvvəllər mövcud deyildi, hətta on altıncı əsrdə fransız filosof Jean Bodin onu “*ərəb filosofları içində ən ağıllısı*”[10] hesab edirdi. əl-Ğazzəli’dən sonra İslam aləmində təbiət elmləri süquta uğramayıb, əksinə tərəqqisinə davam edib. Ondan sonra İbn Bəccə,

---

[8] əl-Ğazzəli, “Təhəfut əl-Fələsifə”, səh: 225; əl-Məktəbə əl-Asriyyə, Beyrut, 2009

[9] Steven Weinberg, “A Deadly Certitude”, (2007); https://www.the-tls.co.uk/islam-and-science-hideous-way/

[10] Frank Griffel, “The Western Reception of al-Ghazali’s Cosmology from the Middle Ages to the 21st Century”, səh: 46; Divan Disiplinlerarası Çalışmalar Dergisi, cild 16, say 30 (2011/1)

İbn Tufeyl, İbn Rüşd, əl-Bitruci kimi filosoflar yaşayıb fəaliyyət göstəriblər. Ptolomeyin "Almagest" kitabına "Təhrir əl-Məcisti" və Evklid'in "Həndəsə Elementləri" (Elements of Geometry) kitabına "Təhrir Kitəb Usul əl-Həndəsə li Uqlidis" adlı kommentariyaları yazmış Nəsirəddin Tusi (1201-1274) vaxt baxımından əl-Ğazzəli'dən sonra yaşayıb. Məşhur həkim İbnun-Nəfis (1213-1288), riyaziyyatçı astronom alim Qutbuddin əş-Şirazi (1236-1311), görkəmli astronom və mühəndis İbnuş-Şatir (1304-1375), məşhur kimya alimi Aydəmir əl-Cildəki (vəfatı 1342), riyaziyyatçı əl-Bircəndi (vəfatı 1528) və daha bir çox müsəlman alim əl-Ğazzəli'dən sonra yaşayıb yaradıblar. George Saliba bunun mif olduğunu təsdiqləyərək deyir ki, "**biz hələ təkcə zamanımıza qədər gəlib çatmış elmi dokumentlərə nəzər salsaq əl-Ğazzəli'dən sonrakı əsrlərdə az qala elmin bütün sahələrində xeyli çiçəklənən fəaliyyətin xəttini açıq şəkildə çəkə bilərik.**"[11] Bizim zamanımıza qədər gəlib çatmamış materiallar daha çoxdur. Buna görə də bəzi tarixçilər deyirlər ki, İslam dünyasının elmi inkişaf tarixini yazmaq mümkün deyildir, yalnız bəzi epizodları bərpa etmək mümkündür, çünki məhv olmuş, zamanımıza qədər gəlib çatmamış dokumentlər haqqında bir söz deyə bilmirik. əl-Ğazzəli üzrə mütəxəssis tədqiqatçı alim Michael E. Marmura fəlsəfə tarixi jurnalında bu mövzunu ətraflı şəkildə müzakirə edir və əl-Ğazzəli'nin müşahidələr ilə sabit olmuş təbiət elmlərinin əleyhinə olmadığını, əksinə o elmləri qəbul etdiyini sübut edir.[12] Hətta Emily Savage-Smith İslam alimlərinin ölü cəsədləri yarmağa münasibəti barəsində yazdığı araşdırmada əl-Ğazzəli'nin öz dövründəki tibb elminə böyük stimul verdiyini qeyd edir.[13] Bu deyilənlərin həqiqət olduğunu görməkdən ötrü çox uzağa getməyə ehtiyac yoxdur. Bizə "Təhəfut əl-Fələsifə" kitabının özünü oxumaq bu iddianın mifdən başqa bir şey olmadığını anlamaq üçün kifayət edir. əl-Ğazzəli kitabının girişində İslam filosofları ilə digər qruplar arasında gedən müzakirələri ümumilikdə üç hissəyə ayırır. Bunlardan birinci hissənin terminlərlə bağlı olduğunu deyir və ona cavab verməyin mənasız olduğunu vurğulayır. İkinci qisim isə "**əslən məzhəblərinin dinin əslləri ilə toqquşmadığı və peyğəmbərlərə və rəsullara iman etməyin onlarla (yəni filosoflarla) münaqişəni zəruri etmədiyi**" mövzulardır. Daha sonra buna misallar verir: "**Buna misal onların bu sözüdür ki, Ay eklipsi Yer kürəsinin onunla Günəşin ortasına girməsi ilə ayın işığının itməsidir, beləki Ay öz işığını Günəşdən alır və Yer kürədir və səma onu hər tərəfdən əhatə edir, beləliklə də Ay əgər Yerin kölgəsinə düşərsə Günəşin işığı ondan kəsilər. Bunun bir başqa misalı onların bu sözüdür ki, Günəş eklipsi Ayın cisminin müşahidəçi ilə Günəşin arasına düşməsidir və bu, bir dərəcəyə düşən kəsişmə nöqtələrində onların birləşməsidir.**" Bunları qeyd etdikdən sonra əl-Ğazzəli deyir: "**Biz həmçinin bu fənni də inkar etməyə çalışmırıq, çünki bunu inkar etmək heç bir məqsədə xidmət etmir. Hər kim bunu inkar etmək üçün mübahisə etməyin dindən olduğunu güman edərsə dinə qarşı cinayət etmiş və dinin nüfuzunu zəiflətmiş olur. Çünki bu məsələlər hesabla bağlı elə həndəsi sübutlar ilə təsdiqini tapıb ki, onlarla birlikdə şübhə qalmır; hətta eklipslərin hər ikisini də, onların tam və ya qismən tutulacaqlarını və nə qədər müddət davam edəcəklərini xəbər verə biləcək qədər bu mövzuları öyrənmiş, dəlillərini yaxşı bilən birinə bunların şəriətə zidd olduğu deyilsə o bunda şübhə etməyəcək, əksinə şəriətdə şübhə edəcək. Heç bir ölçüsüz, qaydasız şəkildə dinə dəstək çıxmağa çalışanın dinə vurduğu zərər bir qayda ilə**

[11] George Saliba, "İslamic Science and the Making of the European Renaissance", səh: 21; Massachusetts Institute of Technology, 2007

[12] Michael Marmura, "Ghazali and Demonstrative Science", Journal of the History of Philosophy, üçüncü cild, ikinci nömrə, 1965 oktyabr, səh: 183-204; The John Hopkins University Press, 2008

[13] Emily Savage-Smith, "Attitudes toward Dissection in Medieval Islam", səh: 94-97; Journal of the History of Medicine and Allied Sciences, 50-ci say (1995)

**dinə düşmənçilik edənin vurduğu zərərdən daha çoxdur. Həqiqətən də deyənlər doğru deyiblər: "Ağıllı düşmən cahil dostdan xeyirlidir.**" Gördüyümüz kimi əl-Ğazzəli çox aşkar şəkildə qeyd edir ki, hesablamalara və müşahidələrə əsaslanan elmi kəşflər qətidir və onları inkar etmək və ya təsdiq etmək dinin mövzusu deyildir. əl-Ğazzəli bu tezisi ilə əslində müasir bioloq Stephen Jay Gould'u qabaqlamış olur. Çünki onun təbiət elmlərinin mövzusunu dini mövzulardan ayırdığını aşkar şəkildə görə bilirik, həmçinin aydın bir dildə qeyd edir ki, hər iki elm sahəsinin araşdırma obyektləri fərqlidir. "**Allahın elçisi – salləllahu aleyhi va sələm – deyib: "Günəş və Ay Allahın ayələrindən iki ayədir; heç kimin ölümünə və ya doğuluşuna görə tutulmurlar. Siz onu görsəniz Allahı zikr etməyə və namaza tələsin!" Bunu göstərib soruşsalar ki, bu onların dediyi ilə necə uyğun gəlir? Deyərik ki, burada onların dediklərinə zidd heç bir şey yoxdur, çünki burada sadəcə olaraq eklipsin kiminsə ölümü və ya doğuluşuna görə baş verməsi iddiası rədd olunur və bu hadisə zamanı namaz qılmaq əmr olunur. Şəriət onsuz da (günəş) zeniti keçdikdə, batdıqda və çıxdıqda namaz qılmağı əmr edir, o zaman eklips zamanı da bunu xoş görərək əmr etməsində problem nədir ki?! Əgər desələr ki, hədisin axırında - "lakin Allah bir şeyə təcəlli etsə Ona boyun əyər" dediyi rəvayət olunub, beləliklə də bu, eklipsin təcəlli səbəbi ilə boyun əyməsidir. Deyərik ki, bu əlavə sözlər nəql baxımından səhih deyildir, ona görə də onu nəql edəni təkzib etmək lazımdır. Doğru şəkildə rəvayət olunan bizim qeyd etdiyimizdir. Hətta əgər səhih olsa belə qəti bilinən şeyləri inkar etmək əvəzinə bunu təvil etmək daha asandır. Aşkarlıqda bu həddə çatmayan o qədər əqli dəlillər əsasında o qədər zahiri mənalar təvil olunub ki! Ateistləri sevindirən ən böyük səbəblərdən biri də dini müdafiə edən bir kəsin bu və bunun kimi şeylərin şəriətə zidd olduğunu açıqdan söyləməsidir, o zaman şəriəti inkar etmək onun üçün asanlaşmış olur.**" Düşünürəm ki, əl-Ğazzəli'nin bu sözlərinin xüsusi bir şərhə ehtiyacı yoxdur. əl-Ğazzəli bir daha təsdiqləyir ki, təbiət elmlərindən qəti olaraq bilinən faktlar ilə din arasında bir ziddiyyət olmaz. Təbiət elmlərindən bilinən bəzi faktların dinə zidd olduğunu iddia edən dindarları da sərt bir dil ilə qınayır. Bu ikinci qismi bitirərkən deyir: "**Bu isə ona görədir ki, (fəlsəfədə) aləm barəsində araşdırma onun sonradan ortaya çıxmış olması yoxsa qədim olması barəsindədir. Sonra əgər sonradan yaradılmış olduğu sabit olarsa onun kürə və ya bəsit və ya altı guşəli və ya səkkiz guşəli olması arasında (din baxımından) bir fərq yoxdur, səmaların və onun altındakıların on üç qat – necəki (filosoflar) belə deyir – və ya daha az və ya daha çox olması arasında bir fərq yoxdur. Bu məsələlərə nəzər salmağın ilahiyyat araşdırmalarına nisbəti soğanın qatlarına və o qatların saylarına və ya narın dənələrinin sayına baxmaq kimidir. Çünki bunların necə olmasından asılı olmayaraq (ilahiyyat mövzularında) əsəs məqsəd bunların Allahın felindən olmasıdır.**"[14] Qısacası üçün dini mövzularda önəmli olan Yerin forması, böyüklüyü və ya kiçikliyi deyildir, önəmli olan ilahiyyat məsələləridir. əl-Ğazzəli heç bir vəch ilə filosofların təbiət elmlərinə dair iddialarını münaqişəyə çəkməyib. Ondan sonra gələn alimlər də eyni münasibəti nümayiş etdiriblər. Hətta əl-Ğazzəli'dən iki əsr sonra yaşamış İbn Teymiyyə kimi bir alim filosoflar haqqında danışarkən deyir: "**... buna görə də onların təbiət elmlərindəki rəylərindən fərqli olaraq ilahiyyat mövzusundakı rəyləri ən fəsadlı rəylərdəndir.**"[15] Onların ilahi, dini, metafizik rəylərini qınayarkən təbiət elmləri haqqında dedikləri sözlərin doğruluğuna da şahidlik etmiş olur. Yenə bir başqa yerdə deyir: "**Filosofların təbiət elmlərində elə dərin məşğuliyyətləri və təfsilatlı izahları var ki, bununla başqalarından seçiliblər.**

---

[14] əl-Ğazzəli, "Təhəfut əl-Fələsifə", səh: 46-47; əl-Məktəbə əl-Asriyyə, Beyrut, 2009
[15] İbn Teymiyyə, "Məcmu əl-Fətəva", 12/154; Məcmə əl-Məlik Fəhd, Mədinə, 1995

**İlahiyyat isə fərqlidir, o mövzuda insanların ən cahilləridirlər.**”[16] Burada ilahiyyat elmlərində onların nə qədər elmli, nə qədər cahil olmaqları məqaləmizin mövzusu deyildir. Nümayiş etmək istədiyimiz dünyəvi elmlərə qarşı İslam tarixində müqavimətin olmadığını göstərməkdir. Bu müqavimət nə əl-Ğazzəli'dən, nə də qeyrisindən sadir olmayıb. Təbiət elmlərinə bu münasibət hətta Osmanlı dövlətinin sonlarında şeyxul-islam məqamını məşğul etmiş məşhur din alimi Mustafa Sabri'nin (1869-1954) sözlərindən də anlaşılır: “**Lakin bununla belə deyirəm ki, eksperimental təbiət elmlərindən götürülmüş dəlil - onunla yanaşı fəlsəfi əqli dəlilə əsaslanılmazsa - Allahın mövcudluğunu sübut etmək üçün kifayət deyildir və Onun isbatı həmin elmlərin mövzusu və məqsədi deyildir.**”[17]

İslam aləmi haqqında dillərə düşmüş ilk əfsanə əl-Ğazzəli'də başlayıb onunla qurtarmır. Bu ümmətin mirasını görməməzlikdən gəlmək adətinin tarixi qədimdir. Müsəlmanları sadəcə olaraq yunanların elmini növbəti əsrlərə ötürənlər kimi təqdim etmək istəyənlər çoxdur. Din ilə elmi qarşı-qarşıya qoymaqda maraqlı olanların xüsusilə İslam dini və müsəlman alimləri, ümumilikdə isə din adamları haqqında yaydıqları əfsanələri saymaqla bitirmək olmur. Bu gün Giordano Bruno (1548-1600) “elmin ilk şəhidi” kimi tanıdılır və guya katolik kilsəsi onu astronomik iddialarına görə edam edib. Bu da növbəti əfsanələrdən biridir. Sheila Rabin “Stanford Fəlsəfə Ensiklopediyasında” yazır: “**Giordano Bruno bir bidətçi kimi dirəyə bağlı yandırıldıqda bunun Kopernikin kosmoloji yazıları ilə heç bir əlaqəsi yox idi və bu, Finocchiaro'nun Brunoya qarşı yönəldilmiş ittihamların rekonstruksiyasında aydın şəkildə göstərilir.**”[18] Giordano Bruno sözün həqiqi mənasında bir alim olmayıb, lakin fəlsəfə ilə məşğul olub. Frances A. Yates qeyd edir ki, “**Bruno qəti dindar hermetist idi; (yəni) Asclepius'da izah olunduğu kimi misirlilərin sehrbazlıq dininə inanırdı.**” Bruno sadəcə olaraq mistisizm ilə məşğul idi və Yates'ə görə o, “**Kopernikin diaqramını ilahı sirlərin heroqlifi kimi yozaraq Kopernikin elmi işini elmdən əvvəlki dövrə, geriyə doğru hermetizmə doğru itələyirdi.**”[19] Yates'in kitabı hələ də bu günə qədər Bruno haqqında yazılmış ən yayğın kitabdır. Stanley Tambiah da bu fikirləri təsdiqləyərək deyir ki, “**Kopernikin günəşinin Ficino'nun günəş sehri ilə əlaqəsinin olduğuna inanaraq o, kopernikanizmi dəstəkləyirdi.**”[20] Marsilio Ficino (1433-1499) astronomiya və sehrlə məşğul olmuş renessans rahiblərindən biri idi. Yəni ki, Kopernikin modelini dəstəkləməsinin elmi araşdırmalar etməsi ilə heç bir əlaqəsi yox idi, mistik fəlsəfə ilə bağlı səbəblərdən çıxış edərək o modeli müdafiə edirdi. Brunonun sehrlə məşğul olduğu, astronomiya və fəlsəfə ilə maraqlandığı məlumdur. Ancaq nə bu günün, nə də o dövrün standartlarına görə onu alim saymaq olmaz. Carl Sagan'ın “Cosmos” kitabında, həm də kitab üzərində bina edilmiş və Neil deGrasse Tyson tərəfindən aparılan sənədli filmdə Bruno süjetin əsas qəhrəmanı kimi təqdim olunur, ən azından baş qəhrəmanlardan biri kimi göstərilir. Hətta filmdə belə Tyson Brunonu təqdim edərkən onun alim olmadığını etiraf edir. Hilary Gatti bu tarixi şəxsiyyət haqqında yazdığı kitabın müqəddiməsində deyir: “**Buna baxmayaraq o dövrün Paracelsus, Johannes Kepler, Tycho Brahe, William Gilbert, William Harvey kimi və sonradan Galileo və Francis Bacon kimi təbiət filosofların yeni elmlə**

[16] İbn Teymiyyə, “Məcmu əl-Fətəva”, 19/163;
[17] Mustafa Sabri, “Məvqiful-Aqli val-İlmi val-Aləmi min Rabbil-Aləmin va İbədihi əl-Mursəlin”, 1/203; Dar İhyə ət-Turas əl-Arabi, Beyrut, 1981
[18] Sheila Rabin, “Nicolas Copernicus”, Stanford Encyclopedia of Philosophy; https://plato.stanford.edu/entries/copernicus/
[19] Frances A. Yates, “Giordano Bruno and The Hermetic Tradition”, səh: 155; Routledge, London, 1999
[20] Stanley J. Tambiah, “Magic, Science and Religion and the Scope of Rationality”, səh: 27; Cambridge University Press, Cambridge, 1990

**məşğul olduqları, az və ya çox təbii səbəblər və nəticələr ətrafında metodik araşdırmalar apardıqları deyilə bilər. Hər kəs Bacon'un bu kateqoriyaya daxil olmasında razılaşmayacaq, amma əminliklə deyə bilərik ki, Bruno bura daxil deyildir. O heç zaman özünün astronomik müşahidələrini aparmayıb. Onun qədim atomizmin yenidən kəşf olunmasındakı töhfələri tamamilə teoretik idi...**"[21] Kilsə Giordano Bruno'nu məhkəməyə cəlb etdikdə, onu dustaq olaraq saxladıqda və sonunda yandırdıqda bunu onun təbiət elmlərinin nümayəndəsi olaraq gördükləri üçün etməmişdilər. Qısacası Bruno nə Kopernikin modelini müdafiə etdiyi üçün, nə də hansısa digər kosmoloji bir kəşfdən ötrü kilsə tərəfindən təqib olunmamışdı. Burada din ilə elm arasında, daha dəqiq desək dindarlar ilə bir alim arasındakı qarşıdurmadan söz gedə bilməz. Sadəcə olaraq o, dini məsələlərdə səsləndirdiyi mistik, qeyri-ənənəvi fikirlərinə görə, okultivizmlə məşğul olduğu üçün kilsənin qəzəbini öz üzərinə çəkmişdi. Əgər sən kilsənin nüfuzunun güclü olduğu bir cəmiyyətdə İsa Məsihi sehirbaz adlandıracaqsansa, kainatın sonsuz və ədəbi olduğunu iddia edəcəksənsə, İsa ilə bağlı möcüzələri yalan adlandıracaqsansa o dövrün şərtlərinə görə kilsənin marağını doğurmuş olacaqsan. Orta əsrlərin kilsəsi bu cür elmi iddialara görə insanları öldürmürdü. Əgər Brunonun 1600-cü ildə yandırılmasının səbəbi günəşin planetar sistemin mərkəzində olduğunu demək idisə bundan 10 il sonra, yəni 1610-cu ildə Galileo "Sidereus Nuncius" kitabını nəşr edərdimi?! Sən saymaq istəsən əlbəttə ki, Brunonu dini pluralizmin fədaisi saya bilərsən, amma o, "elmin ilk şəhidi" adını daşımağa əslən layiq deyildir və din ilə elm arasında iddia olunan konfliktin qurbanı olmayıb. O dövrün Brunosu üçün bizim zamanımızdan birini misal verməli olsaq bəlkə də Deepak Chopra yaxın bir namizəd ola bilər. Chopra da öz mistik fikirlərini kvant fizikası ilə bağlamağa çalışır. Zamanımızın ateistləri Chopranın timsalında ağzına "elm" sözünü alanlarla istehza edirlər, amma Brunonu elmin ilk şəhidi adlandırmaqda bir problem görmürlər. Bunun yalan olduğunu araşdırıb öyrənmək çətin deyildir. Lakin bildiyimiz kimi yalan tez yayılar. Mark Twain'ə nisbət olunan sitatda deyir: "*Haqq ayaqqabılarını hələ geyinənə qədər yalan dünyanın yarısını səyahət edir.*" Bu sitatın gücü ondadır ki, bu sitatın Mark Twain'ə aid olması özü də yalandır. Hətta yaxşı reklam olunan yazıçı Dan Brown kitabında deyir: "**Tarixin əvvəlindən," Langdon izah etdi ki, "elm ilə din arasında böyük bir yarıq olub. Kopernik kimi açıqdilli bir alim... elmi həqiqətləri kəşf etdiyi üçün kilsə tərəfindən öldürülmüşdü. Din hər zaman elmi təqib edib.**"[22] Görünür ki, Dan Brown ümumiyyətlə oxuculara rahatlıqla sata biləcəyi bir fikri yalan faktla bəzəməkdə heç bir eyib görmür, bəlkə də özü tarixi hadisələri dəqiqləşdirməkdə tənbəllik edib. Amma Koperniki kilsə öldürməyib, yaşlanıb və xəstələnərək ölüb. Fəqət nə edə bilərik ki? Kitab çap olunub və minlərlə insan kitabı oxuyub və beyinlərində bir təsəvvür formalaşıb.

Bəli! Kilsə ümumən Brunonu elmi kəşfinə görə yandırmasa da heliosentrik modeli də qəbul etmirdi. Kilsə geosentrik modeli müdafiə edirdi və onlara görə başqa iddialar xətalı idi. Bunu qınamaq asandır. Amma bir dəqiqə dayan və düşün! Kilsə nə üçün axı Kopernikin və ya onun kimi barmaqla saya biləcəyimiz bəzi astronomların fikirlərini qəbul etməli idi? Kopernikin iddiası o dövrün elmi icmasında mövcud olan konsensusa qarşı idi. Bu gün belə elmi konsensusa qarşı gələn bir iddianı rahat-rahat qəbul etmirik. Bəzən belə bir halın dəyişməsi üçün yarım əsr və ya bir əsr vaxt keçməli olur. Kilsənin o dövrdəki reaksiyası çox normal idi və kilsənin öz astronomları var idi. Bilmək lazımdır ki, Avropadakı universitetlərin ən böyük sponsorlarından biri də kilsə olub. Çox zaman bu mövzu haqqında danışarkən bu cür faktları göz ardı edirik. Amma əgər din ilə elm

---

[21] Hilary Gatti, "Giordano Bruna and Renaissance Science", səh: 2; Cornell University Press, New York, 1999
[22] Dan Brown, "Angels & Demons", səh: 28; Washington Square Press, New York, 2000

arasındakı əlaqəni mövzu obyekti ediriksə bu cür tarixi faktları da nəzərə almağımız lazımdır. Bəli, bəzi hallarda din elmin inkişafına mane ola bilər. Philipp Stölzl'in rejissorluğunu etdiyi The Physician (2013) filmində din alimlərinin elmin inkişafına mane olduqları canlandırılır. İsfahanda mollalar İbn Sinanın ölüləri gizlində yaran ingilis tələbəsini şeytanlıqda ittiham edir. Bu filmin bir fiksiya olduğunu dərk etmək çətin deyildir, ancaq biz yenə də bilirik ki, tarixdə ölüləri yarmaq dini dairələrdə qəbul görməyib. Fəqət ölüləri elmi məqsəd üçün yarmağı şeytanlıq kimi dəyərləndirmək fikri dini bir fikir deyildir. Dinin buna müqaviməti ümumilikdə dinin insanın istər dirisi, istərsə də ölüsü üzərinə qoyduğu yüksək qiymətindən qaynaqlanır. Bu gün belə insanlar ölülərinin elmi laborotoriyalarda eksperiment obyekti olmasına qarşı çıxırlar. Bu, dinin özlüyündə elmə qarşı çıxması kimi dəyərləndirilməməlidir. Qərbdə zamanımızın etik qaydaları heyvanların eksperiment obyekt kimi istifadə edilməsini qadağan edir. Biz bunu misal olaraq istifadə edib "etik qaydalar elmə qarşıdır" demədiyimiz kimi adekvat hallarda dini də ittiham edə bilmərik. Əgər biz bu cür misallar verərək din ilə elmi qarşı-qarşıya qoymağı doğru hesab edəcəyiksə eyni tərzdə başqa ünsürlərlə də elmi üzləşdirə bilərik. Tarixdən misallar verib bu cür cürətli nəticələr çıxarmaq çətin deyildir. Misal üçün mən bu üslubu istifadə edib "ateizm ilə elm bir-birinə ziddir" iddiasını edə bilərəm. Yaxın keçmişimiz Jdanovşina siyasətinin (1946-1953) şahidi olub. Stalinin erasında sənətkarlar, alimlər və intellektuallar çalışmalarını, araşdırmalarını partiya xəttinə uyğunlaşdırmalı idilər. Sovetlərin ateist materialist ideologiyası kainatın sonsuz və əzəli olmasını, sabit zəminə sahib olmasını tələb etdiyi üçün Big Bang nəzəriyyəsi, nisbilik nəzəriyyəsi, kvantum fizikası şiddətlə rədd edilirdi. Bu nəzəriyyələr "burjuaziya idealizmi" kimi təbliğ olunur və qınanırdı.[23] Bunu dəstəkləyən elmi çalışmalara məhdudiyyətlər qoyulurdu. Sovet astronomu Boris Voronçov Velyaminov eyni ideologiyanın təsiri ilə öz həmyerlisi George Gamow'u "amerikanlaşmış mürtəd" adlandırırdı.[24] əl-Ğazzəli əgər filosofları – elmi yox – dini iddialarına görə mürtəd adlandırırdısa Voronçov həmkarını məhz elmi iddialarına görə mürtəd adlandırırdı. "**Bu gün o dövrün atmosferini təsəvvür etmək çətindir ki, Heisenberg'in əminsizlik prinsipi haqqında danışmaq dialektik materializmin əsaslarına birbaşa hücum kimi dəyərləndirilirdi.**"[25] O zamanlar nisbilik nəzəriyyəsini, kvantum fizikasını dəstəkləyən alimlər sovet ideoloqları tərəfindən burjuaziya pozuntuları, trotskizmin qalıqları, anti inqilabçılar kimi dəyərləndirilirdilər. Bu cür ittihamlar nəticəsində Boris Hessen və məsləkdaşı A. O. Apirin bu cür ittihamlar nəticəsində NKVD tərəfindən 1936-cı ilin dekabr ayında güllələndilər. Konflik tezisini müdafiə edənlər üçün Brunonun misalını məharətlə istifadə etməyə icazə varsa eyni şəkildə Hessen'in misalını göstərib ateizm ilə elm arasında konfliktin olduğunu da iddia etmək olar. Elmi təmsil etdiyi iddia olunan Brunonun simasında tək bir nəfəri öldürülməsi qarşısında xristianlıq hegemoniyasının heç olmasa iki mileniuma yaxın yaşı var, amma ateizmin son bir əsr içindəki ağalığı müddətində öldürdüyü alimlərin sayını bir tək Allah bilir. Biz dinə qarşı istifadə olunan eyni üslubla ateizmə qarşı ciddi bir "iş" ortaya çıxara bilərik. Lakin belə bir üslubun akademik olmadığını bilirik və bunun müzakirələrimizə pozitiv bir xidmət göstərmədiyinə inanırıq.

---

[23] Helge Kragh, "Cosmology and Controversy; the Historical Development of Two Theories of the Universe", səh: 262; Princeton University Press, New Jersey, 1996
[24] Helge Kragh, "Masters of the Universe; Conversations with Cosmologists of the Past", səh: 188; Oxford University Press, Oxford, 2015
[25] S.N. Korsakov, A.B. Kozenko, Q.Q. Qraçeva, "Boris Mixayloviç Qessen; 1893-1936", səh: 144, Nauka, Moskva, 2015

Nisa xanımın məqaləsində bu baxımdan verdiyi misallar da təəccüblüdür: "*Baxmayaraq ki, Kopernik də, Qaliley də hər ikisi ilahiyat təhsili almış inanclı katolik idilər, onlar Yer kürəsinin kainatın mərkəzi olmadığına dair fikirlər və faktlar irəli sürdükdə Katolik kilsənin inkvizisiya məhkəmələri bu alimlərin İncilə zidd olan elmi kəşflərini inkar edib və bəzən özlərini də təqib etdi.*" Belə bir təqdimat doğru deyildir. Kopernik 1543-cü ildə "De Revolutionibus" kitabını çap etdikdə onu Roma papası üçüncü Pavelə həsr etmişdi. Kitabı çap etdikdən iki ay sonra da özü ölüb. 1616-cı ilə qədər kitab Avropada alimlərin və tədqiqatçıların ixtiyarında idi və kilsə kitabı qadağan etməmişdi. Əksinə Kopernikin kilsə ilə gözəl münasibətləri var idi və kitabına görə kilsə tərəfindən təqib olunmamışdı. Kopernikin irəli sürdüyü model təkcə kilsə tərəfindən yox, öz dövrünün elmi icması tərəfindən də qəbul olunmurdu, çünki model bəzi fenomenləri izah etməkdə aciz idi və Kopernikin öz modelini sübut etmək üçün təqdim etdiyi sübutlar xətalı idi. Hər bir halda kilsənin, eləcə də elmi icmanın bu modeldən imtina etməsinin normal bir izahı mövcuddur.[26] Galileo da istisna deyildi. Kopernikə nisbətdə daha güclü arqumentlər istifadə etməsinə baxmayaraq heliosentrizm hələ də zəif bir model olaraq qalırdı və müşahidə olunan problemlər hələ də çözülməmişdi. Üstəlik bu model empirik olaraq sübut edilməmişdi. Heliosentrizmin tam qəbul edilməsi üçün hələ bir müddət empirik dəlillərin təqdim olunması tələb olunacaqdı. James Bradley (1693-1762) ilk stellar aberrasiyanı[27] müşahidə edərək qeyd etməsi bunun empirik dəlillərindən sayılır, daha sonra Giuseppe Calandrelli (1749-1827), Thomas Henderson (1798-1844), Friedrich Bessel (1784-1846) stellar parallaksı[28] nümayiş etdirməklə daha konkret empirik dəlillər təqdim etdilər. Bütün bu müşahidələrə qədər Kopernikin, Galilei'nin, Keplerin əsərləri teoriyadan kənara çıxmırdı və real sübutlara ehtiyac duyurdu. Bu baxımdan kilsənin mövqeyini başa düşmək çətin olmamalıdır. İnkvizisiyanın əsas fiqurlarından biri kardinal Roberto Bellarmine kilsənin mövqeyini 1615-ci ildə aprel ayının 12-sində kilsə xadimi Paolo Antonio Foscarini'yə yazdığı məktubunda ifadə edir. Foscarini kilsə daxilində Galileo'nun fikirlərini müdafiə edən və onların Bibliyaya zidd olmadığını göstərməyə çalışan rahiblərdən biri idi. Bellarmine öz məktubunda Foscarini'nin "müqəddəs kitab" ilə heliosentrizmi birləşdirmək cəhdlərinə heç də doqmatik cavab vermir, əksinə çox balanslı şəkildə qarşılöq verir. Məktubunu "çox hörmətli ata Paolo Antonio Foscarini'yə" xitabı ilə başlayan Roberto Bellarmine'nin ən maraqlı sözləri növbəti sətrlərdədir:
"**Üçüncü: Mən deyirəm ki, əgər Günəşin dünyanın ortasında, Yerin isə üçüncü səmada olduğuna və Günəşin Yerin ətrafında fırlanmamasına, əksinə Yerin Günəşin ətrafında fırlanmasına dair həqiqi nümayiş/sübut olarsa o zaman Müqəddəs Kitablarda bunun əksinə olduğu görünən hissələri böyük qayğı və diqqətlə izah etməli olacağıq və göstərilən nümayişin saxta olduğunu deməkdənsə onları (yəni müqəddəs mətnləri) anlamadığımızı demək daha doğru olacaq. Lakin mənə göstərilməyənə qədər belə bir nümayişin olduğuna inanmayacam. Günəşin mərkəzdə və Yerin səmada olduğunu göstərməklə zahiri görüntünü qorumağı nümayiş etdirməklə Günəşin mərkəzdə və Yerin səmada olduğunu həqiqətən**

---

[26] Tim O'Neill, " Why was the Catholic Church so opposed to heliocentrism"; https://www.quora.com/Why-was-the-Catholic-Church-so-opposed-to-heliocentrism-for-example-in-the-Renaissance-Why-did-they-not-simply-claim-that-God-lived-in-the-Sun-so-we-go-around-Him/

[27] Stellar aberrasiya Yer kürəsinin hərəkət etməsi səbəbi ilə ulduzdan gələn işığın istiqamət dəyişməsidir, bu istiqamətdəki dəyişiklikləri izlədikdə elips forması cızdığını görürük. Bu da Yerin Günəş ətrafındakı elips formalı hərəkətini təmsil edir.

[28] Stellar parallaks bizə yaxın ulduzu yer dəyişərkən müşahidə etməkdir. Bunu isə biz daha uzaq bir ulduza görə müəyyən edə bilirik. Çünki Yer kürəsi hərəkət etdikcə daha yaxın ulduz uzaq ulduza nisbətən bizə daha yaxın olduğu üçün daha çox yer dəyişməlidir. Bir yaxın ulduz bu şəkildə uzaq ulduzla müqayisə edilir və hətta triqonometriyanın vasitəsi ilə bizə uzaqlıq məsafəsi də ölçülə bilir.

**nümayiş etdirmək eyni şey deyildir. Çünki mən inanıram ki, birincini nümayiş etdirmək mümkündür, amma ikincisi barədə böyük şübhələrim vardır və şübhə olduğu halda Müqəddəs Kitaba müqəddəs ataların verdikləri izahı tərk etmək olmaz.**”[29]
Bir sözlə inkvizisiyanın əsas fiquru etiraf edir ki, heliosentrizm kifayət qədər dəlillər ilə sübut olunmayıb. Zahirən planetlərin yerlərini göstərə biləcək bir heliosentrik modeli təqdim etmək qəti bir sübut sayılmır. Eyni zamanda qəbul edilirdi ki, belə bir kosmoloji model sübut olunduğu təqdirdə kilsə müqəddəs mətnləri o modelə uyğun şəkildə izah etməyə hazırdır. Biz bu nöqtənin üzərində çox durmağa ehtiyac duymuruq. Yalnız bunu əlavə edə bilərik ki, bəzi tarixçilərə görə Avropada reformizmin təsiri altında kilsə reaktiv bir mövqe seçməyə başlamışdı. Bəlkə də Kopernikin yazısına reaksiya verməməkləri, lakin əvəzində Galileo'nun yazısına reaksiya verməkləri bununla izah oluna bilərdi. İstənilən halda bu dövrdən sonra astronomiyanın inkişafında məhz kilsə astronomlarının rolu əvəzsiz idi. Yezuit təhsili görmüş Giovanni Domenico Cassini (1625-1712) Saturn planetinin sputniklərini, halqasını təsbit edən katolik astronomdur. Yezuit müəllimləri Giovanni Battista Riccioli və Francesco Maria Grimaldi'nin dəstəyi ilə orbitin formasını sınamaq məqsədi ilə Bologna şəhərindəki San Petronio kilsəsində bir heliometer inşa edilməsi üçün kilsənin razılığını aldı. Bu heliometrin sayəsində ilin fərqli vaxtlarında Yerin Günəşdən nə qədər uzaqlaşıb, nə qədər yaxınlaşdığını hesablaya bildi. Bununla da orbitlərin Keplerin göstərdiyi kimi elips formasında olduğunu təsdiqlədi. Kopernikin və Galilei'nin müdafiə etdikləri dairəvi orbitlər xətalı çıxdı. Ümumiyyətlə bilmək lazımdır ki, o dövrdə yarışma sadəcə iki model arasında getmirdi. Tycho Brahe, Nicholas Reymers Bär, William Gilbert tərəfindən təqdim olunan modellər də var idi. Tycho'nun model semi-heliosentrik idi və orada Aydan və Yerdən başqa bütün səma cisimləri Günəşin ətrafında fırlanır, Günəş isə Yerin ətrafında fırlanırdı. Keplerin modeli Kopernikin modelindən daha mükəmməl idi, çünki orbitlərin elips formasında olduğunu göstərirdi. Lakin bu modellərin heç biri müasir zamanımızda əldə etdiyimiz məlumatlar işığında doğru deyildi, hər birinin xətası var idi. Cassini kimi yezuit təhsili görmüş digər alimlər də getdikcə heliosentrizmi qəbul etdilər. René Descartes (1596-1650), Pierre Gassendi (1592-1655), Ismael Boulliau (1605-1694) kimi fransız astronomları kilsə ilə çox sıx bağlı alimlər idilər və onlar Keplerin modelini müdafiə edənlər sırasına daxildirlər. Əgər İtaliyada kilsə bir qədər konservativ mövqe tutmuşdusa, digər ölkələrdə kilsənin mövqeyi liberal idi, hətta bu araşdırmalara himayədarlıq edirdi. Həqiqi tarixi araşdırma onu göstərir ki, kilsənin qadağasının astronomiyanın inkişafına təsiri çox zəif idi, çünki kilsənin öz daxilindəki astronomlar belə eyni araşdırmaları, eyni metodları istifadə edirdilər və gec-tez nəticələr ortaya çıxmalı idi.

“*Yuxarıda yazılan misallardan görmək olur ki, dinin təsir gücünə malik olduğu yerdə elm dinin əsarətindən çıxaraq müstəqil şəkildə inkişaf edə bilməyib.*” Bu sözləri ilə yeni bir abzasa qədər qoyan Nisa xanım elə güman edir ki, yuxarıda tərəfimizdən müzakirə olunan misalları verməklə elmin dinin əsarətində olduğunu sübut etmiş olur. Biz daha çox misal verərək sübut edə bilərik ki, əksər hallarda din elmin inkişafına təkan verib. İslam dünyasında astronomik, riyazi, tibbi nəaliyyətlər əsasən dinin təşviqi ilə olub. Bu misalları verərək göstərmək olar ki, elm dinin təsiri altında çiçəklənə də bilər. Bəli, dinin təsiri bəzi sahələrdə elmi inkişafa məhdudiyyət qoya bildiyi kimi digər hallarda isə qol-qanad verə bilər. Daha sonra Nisa xanım bəzi statistik məlumatlara yer verir. Dünyada hər min nəfərdən orta hesabla 41-nəfəri elmi işçi, mühəndisdirsə müsəlman ölkələrində bu rəqəm

[29] Maurice A. Finocchiaro, “The Essential Galileo”, səh: 147; Hackett Publishing Company, Indianapolis/Cambridge, 2008

hər min nəfərdə 9-dur. Müsəlman ölkələrində yerləşən 1800-ə yaxın universitetdən yalnız 312 universitetin əməkdaşı akademik jurnallarda məqalələrini çap etmişlər. Bu statistik məlumatları dəqiqləşdirməyə belə cəhd göstərmədik, çünki ehtiyac yoxdur. Həqiqətən də müsəlman ölkələrində təhsil və tədris ürək açıcı vəziyyətdə deyildir. İşin bu hissəsi aydındır. Lakin aydın olmayan hissə budur ki, Nisa xanım bu məlumatlardan sonra İslam Əməkdaşlıq Təşkilatının 57 üzv ölkəsindən 37-sinin qismən və ya tamamilə şəriət qanunları ilə idarə olunduğunu deyir. Aydın olmayan tərəf budur ki, bu ölkələrdəki zəif göstəricilərin o ölkələrin müsəlman adını daşıması ilə nə əlaqəsi var ki? Məgər onların müsəlman adı daşıması özü-özlüyündə səbəb-nəticə bağı üçün kifayət edirmi? Misal üçün Azərbaycan da həmin təşkilatın üzvlərindən biridir və Azərbaycan müsəlman adını daşıyır. Ölkəmizdə təhsilin, elmi nəaliyyətlərin zəif olmasının bizim müsəlman adı daşımağımızla əlaqəsini necə sübut etmək olar? Azərbaycanda təhsil sistemi sekulyar bir sistemdir, dinin təhsil sistemimizdə heç bir rolu yoxdur və 70-illik sovet əsarəti Azərbaycanın bütün nüfuz dairələrindən dini elementləri təmizləyib. Qismən şəriətlə idarə olunmaq sözü isə xüsusilə maraq doğurucudur. Qismən şəriətlə idarə deyildikdə nikah, miras, vərəsəlik kimi məqallarda şəriətə istinad etmək qəsd oluna bilər. Görəsən bu sahələrdə şəriətlə idarə olunmanın elmi nəaliyyətlərə nə təsiri var ki, Nisa xanım bu faktlara oxucunun diqqətini çəkmək istəyib?! Ümumiyyətlə belə bir qismən şəriətlə idarə edilmə İngiltərə Birləşmiş Krallıqlarında da, Yunanıstanda da mövcuddur. Orada bu kimi məsələlərdə müsəlmanlar üçün şəriət məhkəmələri fəaliyyət göstərir. Həqiqi tədqiqatçı bu zaman İngiltərədə, Yunanıstanda yaşayan müsəlmanların nəaliyyətləri ilə qismən şəriətlə idarə olunan müsəlman ölkələrindəki müsəlmanların nəaliyyətlərini müqayisə etsə görəcək ki, problem "qismən şəriətlə idarə" olunmaqda deyildir, problem ölkədə təhsil üçün yaradılmış şərait və imkanlardadır. Statistika önəmlidir, amma statistik məlumatları doğru analiz etmək ondan da önəmlidir. Fizika sahəsində nobel mükafatına layiq görülmüş 210 nəfərdən yalnız 3-ü qadındırsa, yaxud da kimya üzrə 181 nobel laureatından yalnız 5-i qadındırsa bu statistik məlumat bizə nə deyir? Şahmat üzrə qrosmeysterlerin 1585-inin kişi, 36-sının isə qadın olmasını necə başa düşməliyik? Nisa xanım bu statistik məlumatlardan hesablama, strategiya, problem həll etmək qabiliyyətlərində qadınların kişilərdən zəif olması nəticəsini çıxarırmı? Yaxud da eyni eyni kateqoriyada qaralar ilə ağları müqayisə etsək necə bir nəticə çıxararıq? Həqiqət budur ki, müsəlman ölkələrində elmi işlərin az olmasının din ilə heç bir əlaqəsi yoxdur. Pakistan və İran hər ikisi də İslam dövlətləridir, lakin bu dövlətləri Azərbaycan, Özbəkistan, Tacikistan, Türkmənistan kimi şəriətdən heç bir əsər-əlaməti olmayan müsəlman ölkələri ilə müqayisə etsək elmi nəaliyyətlərinə görə çox irəlidə olduqlarını görəcəyik. Əgər din elmi nəaliyyətlərdə geri olmağın faktorlarından biri olsaydı biz bu gün bunun əksini müşahidə etməli idik. Kök hüceyrələr üzərində araşdırmalara görə ABŞ-dan sonra ikinci yerdə İran gəlir. İran nüvə texnologiyasında da cəhdlər edir. Əgər dünya ölkələri tərəfindən qoyulmuş sanksiyalar olmasaydı İranın elm sahəsindəki nəaliyyətləri daha da çox olardı. Təbii ki, bu dediyim bəzi müşahidələrə əsaslanmış spekulyasiyadır. Ona görə də bu statistik məlumatlara əsaslanaraq İslam dininin mənfi təsirini göstərmək cəhdi çox uğursuzdur.

Müzakirəmizin xülasəsi budur ki, din ilə elm arasında heç bir konflikt yoxdur, amma dindarlar ilə alimlər arasında uyğunsuzluqlar çoxdur. Əksər hallarda bu uyğunsuzluqlar elmi müşahidələrdən fəlsəfi nəticələr çıxararkən, yaxud da dini məlumatlardan elmi nəticələr çıxararkən ortaya çıxır. Bu isə tamamilə yanaşma və metod problemidir.